## Şübhə:

## "Ömər ibn əl-Xəttabın Rəsulullah sallallahu aleyhi və səlləmin son məktubunu yazmasına mane oldu"

**İbn Abbas (Allah onların hər ikisindən razı olsun) deyir ki, Peyğəmbər (Ona və ailəsinə Allahın salavatı və salamı olsun) ölüm ayağında olarkən evdə bir çox insanlar var idi. Ömər də onların arasında idi. Peyğəmbər (Ona və ailəsinə Allahın salavatı və salamı olsun) dedi: Gəlin sizin üçün bir yazı yazım ki, bundan sonra yolunuzu azmayasınız. Ömər dedi: Peyğəmbərin ağrıları çoxalıb. Quran mövcuddur. Allahın kitabı bizə yetərlidir. Evdə olanlar bu məsələdə fikir ayrılığına düşdülər və mübahisə etdilər. Bəziləri deyir, gətirin qoy Allahın elçisi sizin üçün bir yazı yazsın ki, bundan sonra yolunuzu azmayasınız. Bəziləri isə Ömərin dediyini deyirdilər. Onlar Peyğəmbərin (Ona və ailəsinə Allahın salavatı və salamı olsun) hüzurunda çox ixtilaf və boşboğazlıq etdikdə Peyğəmbər (Ona və ailəsinə Allahın salavatı və salamı olsun) dedi:**
**"Çıxın bayıra". Buxari və Müslim[1].**
**Onlar bu hədislə Peyğəmbərin (Ona və ailəsinə Allahın salavatı və salamı olsun) səhabələrinə tənə etmək üçün yalandan deyirlər ki, guya Ömər deyib ki, Peyğəmbər (Ona və ailəsinə Allahın salavatı və salamı olsun) tərk (həcr) olunmalıdır[2].**
**Bu isə Ömərin adından uydurulmuş ağ yalandır. Ömər, Peyğəmbərin (Ona və ailəsinə Allahın salavatı və salamı olsun) tərk olunmasının gərəkliliyini deməmişdir. İki səhih və digər kitablarda nəql olunan rəvayətlərə əsasən Ömər belə demişdir:**
**"Peyğəmbərin (Ona və ailəsinə Allahın salavatı və salamı olsun) ağrıları çoxalmışdır".**
**Həmin zamanlar Peyğəmbərin (Ona və ailəsinə Allahın salavatı və salamı olsun) ölüm qabağı ağrıları şiddətlənmişdi.**
**Aişənin (Allah ondan razı olsun) hədisi deyilənləri daha da açıqlayır. Belə ki, Peyğəmbər (Ona və ailəsinə Allahın salavatı və salamı olsun) huşunu itirəndən sonra özünə gəldikdə demişdi: Camaat namazı qıldımı?**
**Aişə dedi: Ey Allahın elçisi, onlar səni gözləyirlər. Sonra Peyğəmbərə (Ona və ailəsinə Allahın salavatı və salamı olsun) yuyunmaq üçün su təqdim etdilər. Peyğəmbər (Ona və ailəsinə Allahın salavatı və salamı olsun) yuyunduqdan sonra ayağa durub namaza getmək istədikdə huşunu itirib yerə yıxıldı. Ona və ailəsinə Allahın salavatı və salamı olsun! Daha sonra özünə gəldikdə dedi: Camaat, namazı qıldımı?**
**Dedilər: Ey Allahın elçisi, onlar səni gözləyirlər. Peyğəmbər (Ona və ailəsinə Allahın salavatı və salamı olsun) dedi: Mənə su gətirin. Suyu gətirdilər və o yuyundu. Sonra ayağa durub namaza getmək istədikdə huşunu itirib yerə yıxıldı. Ona və ailəsinə Allahın salavatı və salamı olsun! Atam anam ona fəda olsun.**
**Üçüncü dəfə huşunu itirib ayıldıqda dedi:**
**Camaat, namazı qıldımı?**
**Dedilər: Onlar səni gözləyirlər.**
**Peyğəmbər (Ona və ailəsinə Allahın salavatı və salamı olsun) dedi: Əbu Bəkrə deyin, qoy camaata namaz qıldırsın[3].**
**Bəli, orada Peyğəmbərin (Ona və ailəsinə Allahın salavatı və salamı olsun) tərk olunmasını deyən olub, lakin həmin insan Ömər deyildi.**
**Abdullah ibn Məsud (Allah ondan razı olsun) Peyğəmbərin (Ona və ailəsinə Allahın salavatı və salamı olsun) şiddətli ağrı keçirtdiyini gördükdə ona qarşı şəfqətlənib dedi:Ey Allahın elçisi, sən çox ağrı hissi keçirirsən.Peyğəmbər (Ona və ailəsinə Allahın salavatı və salamı olsun) dedi:Mən, sizlərdən iki nəfərin ağrısı kimi ağrı çəkirəm. İbn Məsud (Allah ondan razı olsun) dedi: Ey Allahın elçisi, bu sənin ikiqat savab qazandığına görədir? Peyğəmbər (Ona və ailəsinə Allahın salavatı və salamı olsun) dedi: Bəli[4].**
**Peyğəmbər (Ona və ailəsinə Allahın salavatı və salamı olsun) şiddətli ağrı hissləri keçirirdi. Ömər, Peyğəmbərin (Ona və ailəsinə Allahın salavatı və salamı olsun) "Gəlin sizin üçün bir yazı yazım ki, bundan sonra yolunuzu azmayasınız" – bu sözlərini eşitdikdə ona şəfqət**

**göstərib dedi:Peyğəmbərin (Ona və ailəsinə Allahın salavatı və salamı olsun) ağrıları çoxalıb, Allahın kitabı bizə yetərlidir.**
**Biz, Ömərin bu sözünün Allahın bu ayəsinə müvafiq olduğunu deyirik. Allah təala buyurur:"Bu gün dininizi sizin üçün kamil etdim, sizə olan nemətimi tamamladım və sizin üçün din olaraq islamı bəyənib seçdim"[5].**
**Peyğəmbər (Ona və ailəsinə Allahın salavatı və salamı olsun) demişdir: "Allaha and olsun, Allaha və cənnətə yaxınlaşdıran elə bir əməl yoxdur ki, onun haqqında sizə məlumat verməyim. Allahın əmr etdiyi elə bir şey qalmamışdır ki, sizə onu əmr etməyim. Allahın qadağan etdiyi elə bir şey də qalmamışdır ki, sizi ondan çəkindirməyim"[6].**
**Peyğəmbərin (Ona və ailəsinə Allahın salavatı və salamı olsun) din barəsində bizə çatdırmadığı bir şey qalmamışdır. Bəs, Peyğəmbərin (Ona və ailəsinə Allahın salavatı və salamı olsun) yazmaq istədiyi nə idi?**
**İmam Əhməd (Allah ona rəhmət etsin) Müsnəd kitabında Əlinin (Allah ondan razı olsun) belə dediyini rəvayət edir:**
**Biz Peyğəmbərin (Ona və ailəsinə Allahın salavatı və salamı olsun) yanındaydıq. Birdən o, mənə, ümmətinin özündən sonra yolunu azmaması üçün yazı yazmağa bir şey gətirməyi əmr etdi. Əli deyir: Mən onun (həmin vaxt ərzində) vəfat edəcəyindən qorxub dedim: Ey Allahın elçisi, mən yaxşı əzbərləyir və başa düşürəm. Peyğəmbər (Ona və ailəsinə Allahın salavatı və salamı olsun) dedi: "Mən sizə, namaz və zəkata davamiyyətli olmağı, itaətinizdə olan kölələrə qarşı xoş davranmağınızı tövsiyə edirəm"[7].**
**Əgər qarşı tərəf, səhabələrin Peyğəmbərin (Ona və ailəsinə Allahın salavatı və salamı olsun) əmrinə asilik göstərib ona yazmağa bir şey təqdim etmədiklərini əsas gətirsələr, cavabımız belə olar:**
**Bu işdə ən birinci asilik edən Əli olmuşdur. Çünki yazmaq üçün nəsə gətirmək əmri birbaşa ona ünvanlanmışdı. Belə olan təqdirdə nə üçün Əli ona deyiləni gətirmədi?!**
**Əgər biz bu işə görə Peyğəmbərin (Ona və ailəsinə Allahın salavatı və salamı olsun) bütün səhabələrini məzəmmət ediriksə, Əli də məzəmmət olunmalıdır. Amma əslində bir neçə səbəbə görə bu məzəmmət bütün səhabələrə şamil edilmir.**
**Birinci: Elə həmin hədisdə Əli (Allah ondan razı olsun) deyir: Mən onun (həmin vaxt ərzində) vəfat edəcəyindən qorxub dedim: Ey Allahın elçisi, mən yaxşı əzbərləyir və başa düşürəm. Peyğəmbər (Ona və ailəsinə Allahın salavatı və salamı olsun) dedi: "Mən sizə, namaz və zəkata davamiyyətli olmağı, itaətinizdə olan kölələrə qarşı xoş davranmağınızı tövsiyə edirəm".**
**Deməli, Peyğəmbər (Ona və ailəsinə Allahın salavatı və salamı olsun) bu hədisdə özünün nə yazmaq istədiyini dili ilə demişdir.**
**İkinci: Peyğəmbərin (Ona və ailəsinə Allahın salavatı və salamı olsun) yazmaq istədiyi onun üçün vacib, yaxud müstəhəb idi. Əgər yazılacaq sözlərin vacib olmasını, şəriətdə təbliğ edilməsi zəruri sayılan məsələlərdən olduğunu desələr bu zaman Peyğəmbərin (Ona və ailəsinə Allahın salavatı və salamı olsun) şəriəti tam şəkildə çatdırmadığını demiş olurlar. Bu isə Peyğəmbərə (Ona və ailəsinə Allahın salavatı və salamı olsun) qarşı böyük bir tənədir. Eləcə də bu sözləri deyən Allaha qarşı iftiradır. Belə ki, Allah təala buyurur: "Bu gün dininizi sizin üçün kamil etdim...".**
**Yox əgər onlar yazılacaq şeylərin müstəhəb olduğunu desələr, o zaman bu bizim hamımızın məqbul rəyi sayılar.**
**Üçüncü: Səhabələrin etirazları Peyğəmbərə göstərilən asilikdən deyil, ona qarşı olan şəfqətdən irəli gəlirdi.**

---

**[1] Səhih əl-Buxari. Kitabətul Elm. Bab, Kitabul Elm, 114. Səhihi Müslim. Kitabul Vəsiyyət, 1627.**
**[2] Fəsəlu Əhləz Zikr, səh, 144 və 179. Bu sözlərin müəllifi Ticani, bunları yalan və iftira olaraq Buxarinin adına ünvanlamışdır.**
**[3] Səhih əl-Buxari. Kitabətul əzan. Bab, İnnəmə cuiləl imam liyutəmmə bihi, 687. Səhihi Müslim. Kitabus salat,**

**418.**
**[4] Səhih əl-Buxari. Kitabətul mərda. Bab, şəddunnəsi bələan, 5648. Səhihi Müslim. Kitabul birr vəs silə, 3571.**
**[5] əl-Maidə: 3.**
**[6] Silsilətul Əhadis əs-Səhihə: 4, 417, 1890-cı hədisin şərhi əsnasında qeyd edilmişdir.**
**[7] Müsnədi Əhməd: 2, 161, 655.**